QƏZET 1958-ci İLDƏN NƏŞR OLUNUR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Sentyabr 2018 № 7 (1094)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## "2018-2020-ci illərdə Azərbaycan Respublikasında rəqəmsal ödənişlərin genişləndirilməsi üzrə Dövlət Proqramı"nın təsdiq edilməsi haqqında *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

Rəqəmsal transformasiya və texnoloji innovasiyalar bir çox maliyyə xidmətinə sürətli, asan və effektiv çıxış əldə etməyə imkan verir.

"2018-2020-ci illərdə Azərbaycan Respublikasında rəqəmsal ödənişlərin genişləndirilməsi üzrə Dövlət Proqramı"nın (bundan sonra - Dövlət Proqramı) strateji məqsədi vətəndaş, biznes subyektləri və dövlət strukturları arasında nağdsız ödəniş mühitinin xeyli genişlənməsi, nağd dövriyyənin həcminin minimuma endirilməsi və nəticədə bank sektorunun maliyyə resursları bazasının gücləndirilməsidir. Bu məqsədlə ölkədə rəqəmsal ödəniş xidmətlərinin institusional və hüquqi bazasının gücləndirilməsi, infrastruktur imkanlarının artırılması yolu ilə həmin xidmətlərin çeşidinin, keyfiyyətinin və tətbiq dairəsinin genişləndirilməsi, habelə onlardan istifadənin kütləviləşdirilməsi başlıca strateji prioritetlərdir.

Rəqəmsal ödənişlərin tətbiqinin və istifadəsinin genişləndirilməsi iqtisadi dövriyyələri şəffaflaşdırmaqla, nağd pulla bağlı xərclərin, bank və müəssisələrin əməliyyat xərclərinin azalmasına gətirib çıxaracaq ki, bu da öz növbəsində, vergi bazasının, habelə əhali və müəssisələrin maliyyə xidmətlərinə çıxış imkanlarının genişləndirilməsinə, bank sektorunun kreditləşmə və investisiya imkanlarının gücləndirilməsinə və son nəticədə iqtisadi artıma təkan verəcəkdir.

Bu Dövlət Proqramı Azərbaycan Respublikası Prezidentinin 2016-cı il 6 dekabr tarixli 1138 nömrəli Fərmanı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında telekommunikasiya və informasiya texnologiyalarının inkişafına dair Strateji Yol Xəritəsi"ndə rəqəmsal ödənişlərin genişləndirilməsi ilə bağlı nəzərdə tutulan tədbirlərin icrası və müəyyən olunmuş icra göstəricilərinə nail olmaq məqsədilə hazırlanmışdır.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, Azərbaycan Respublikasında elektron ödəniş xidmətlərinin inkişaf etdirilməsi və tətbiqinin genişləndirilməsi məqsədilə **qərara alıram:**

1. "2018-2020-ci illərdə Azərbaycan Respublikasında rəqəmsal ödənişlərin genişləndirilməsi üzrə Dövlət Proqramı" təsdiq edilsin (əlavə olunur).

2. Azərbaycan Respublikasının Mərkəzi Bankı:

2.1. Bu Sərəncamın 1-ci hissəsi ilə təsdiq edilən Dövlət Proqramında nəzərdə tutulmuş tədbirlərin icrasını əlaqələndirsin;

2.2. Dövlət Proqramında nəzərdə tutulmuş tədbirlərin icrasının gedişi barədə ildə bir dəfə Azərbaycan Respublikasının Prezidentinə məlumat versin.

3. Dövlət Proqramında nəzərdə tutulmuş tədbirlərin icrasının monitorinq və qiymətləndirilməsi Azərbaycan Respublikası Mərkəzi Bankının sifarişi əsasında İqtisadi İslahatların Təhlili və Kommunikasiya Mərkəzi tərəfindən həyata keçirilsin.

4. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham Əliyev,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 26 sentyabr 2018-ci il*

# Pedaqoji Forumun V dinləməsi

**Sentyabrın 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) himayəsi ilə təşkil edilən Pedaqoji Forumun (PF) növbəti-V dinləməsi keçirilib. Görüşdə tanınmış azərbaycanlı alim, Böyük Britaniyanin York Universitetinin MRC Molekulyar Biologiya Tədqiqat İnstitutunda, Kembric Universitetində qrup rəhbəri, professor Qərib Mürşüdov "Müasir Struktur Biologiyası və gələcək perspektivlər" mövzusunda məruzə ilə çıxış edib. Dinləmədə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, şöbə müdirləri, professor-müəllimləri, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) müvafiq elmi-tədqiqat institutlarının, ali təhsil müəssisələrinin alim-mütəxəssisləri, təhsil ekspertləri, pedaqoji ictimaiyyətin nümayəndələri, qeyri-hökumət təşkilatlarının təmsilçiləri və təhsil sahəsindən yazan jurnalistlər iştirak ediblər.**







Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov tədbiri giriş sözü ilə açaraq məruzəçi haqqında məlumat verib. Qeyd edib ki, professor Qərib Mürşüdov 1962-ci il dekabr ayının 19-da Şəmkir rayonunun Dəllər-Cəyir kəndində anadan olub. 1980-ci ildə Bakı Dövlət Universitetinin Tətbiqi riyaziyyat və kibernetika fakültəsinə qəbul olunub. 1985-ci ildə həmin fakültəni fərqlənmə diplomu ilə bitirib. Təyinatla akademik Cəlal Əliyevin rəhbərlik etdiyi Fiziki-Kimyəvi Biologiya Sektorunun Biotexnologiya qrupunda işləyib. İlyarımlıq hazırlıqdan sonra Moskva şəhərinə, SSRİ EA-nın Kristalloqrafiya İnstitutuna göndərilib. 1987-1993-cü illərdə Rusiya Kristalloqrafiya İnstitutunda çalışıb. 1993-cü ildə "Micrococcus lysodeikticus bakteriyasından ayrılmış katalaza fermentinin 1,5 A ayırdetmə dəqiqliyi ilə üçölçülü quruluşu" mövzusunda dissertasiya işini uğurla müdafiə edərək fizika-riyaziyyat elmləri namizədi elmi dərəcəsi alıb. Q.Mürşüdov 1993-2011-ci illlərdə Böyük Britaniyanın York Universitetində işləyib. 2011-ci ildən MRC Molekulyar Biologiya Tədqiqat İnstitunda, Kembric Universitetində qrup rəhbəri kimi çalışır.

Professor Q.Mürşüdov bioinformatika sahəsində tanınmış mütəxəssis kimi Böyük Britaniyanın Kembric Universitetinə dəvət olunmuş ilk azərbaycanlı alimdir. Alimin "Makromolekulyar rentgen kristalloqrafiyası və zülalverilənlər bankı: etibarlı informasiyanın toplanması və istifadəsi" əsəri bioinformatika üzrə ən çox istinad olunan vəsaitlərdəndir. O, bu kitabı ilə bioinformatikanın müasir biologiya elminin zirvəsi olduğunu Avropaya sübut edə bilib. Məşğul olduğu sahə riyaziyyat və kompüter elmlərinin molekulyar biologiyada və əsasən də makromolekulların rentgen kristal strukturunun öyrənilməsində tətbiqidir. Onun proqramlarından makromolekulların strukturu ilə məşğul olan tədqiqatçılar geniş istifadə edirlər. Q.Mürşüdov 60-dan çox elmi məqalənin, bir neçə kitabın və toplunun müəllifi və həmmüəllifidir. Ümumən məqalələrinə, o cümlədən proqramlarına olan akademik istinadların sayı 20 mindən çoxdur. Bu, çox böyük göstəricidir. Xaricdə çalışan azərbaycanlı alimlər arasında ən çox onun işlərinə istinad edilir. Dəyərli alimlə əməkdaşlığımızın davamlı olması çox vacibdir.

Professor Q.Mürşüdov öncə təqdimatın təşkilinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib və universitetin kollektivinə uğurlar arzulayıb. Çalışdığı Molekulyar Biologiya İnstitutunun fəaliyyəti barədə ətraflı məlumat verən alim bildirib ki, institut 1962-ci ildə yaradılıb. 2013-cü ildə yeni binaya köçürülüb. İnstitut Struktur Biologiyanın müxtəlif istiqamətləri ilə məşğul olur. İnstitutda böyük elmi-tədqiqat işləri həyata keçirilir. Alınan elmi nəticələr istehsalata, sənayeyə tətbiq edilir. İnstitutun malik olduğu böyük maliyyə vəsaitinə ciddi nəzarət var və bu vəsaitdən səmərəli istifadə edilir. İnstitutda əlverişli elmi mühit formalaşdırılıb, uzunmüddətli strateji planlar işlənib-hazırlanır, gənc alimlərlə işləməyə xüsusi önəm verilir. İnstitutda 3 nəfər Nobel mükafatçısı çalışır. İnstitutda fəaliyyət göstərən qrup rəhbərləri yüksək səviyyəli alimlərdir, onlar dünyada öz sahələri üzrə lider hesab edilirlər. Qrup rəhbərləri hər 5 ildən bir hesabat verirlər. Hesabatda həyata keçirilmiş işlər və gələcək planlar öz əksini tapır.

Təqdimatında Struktur Biologiya haqqında geniş danışan alim qeyd edib ki, bu elm sahəsi bioloji prosesləri, zülalların və molekulların quruluşunu öyrənir. Struktur Biologiya ötən əsrin 30-cu illərində yaranıb, son illər bu sahədə böyük uğurlar əldə edilib. Biologiya sahəsinə aid olan dərsliklər 5 ildən bir yenidən yazılmalıdır. Yeni dərsliklər yazılarkən müasir elmi nəticələrə əsaslanılmalıdır. Bu, Struktur Biologiyanın inkişafından irəli gələn tələbdir. Struktur Biologiya geniş perspektivlərə malikdir və gələcəkdə daha sürətlə inkişaf edəcəkdir.

Tədbirdə çıxış edən təhsil eksperti, professor Şahlar Əsgərov, dosent Şahin Pənahov, dosent Əli Zalov, baş müəllim, sosioloq Əhməd Qaşəmoğlu və başqaları təqdimatla bağlı fikir və mülahizələrini bölüşüblər.

Tədbirə yekun vuran rektor Cəfər Cəfərov qeyd edib ki, yeni tədris ili ərəfəsində xalqımızın görkəmli alimi, professor Q.Mürşüdovla görüş keçirməyimiz olduqca təqdirəlayiqdir. Xalqın, millətin, dövlətin gələcəyi təhsillə bağlıdır. Müəllim hazırlığı strateji əhəmiyyət kəsb edir. Son illər müəllim peşəsinə maraq xeyli artıb. Bu, çox sevindirici haldır. Biz konkret hədəflərimizi müəyyən etməli, bu istiqamətdə əzmlə çalışmalıyıq. Rektor maraqlı və məzmunlu təqdimata görə alimə təşəkkür edib və ona uğurlar arzulayıb.

**Mənsur İbrahimli**

# “Azərbaycanda əlilliyi olan uşaqlar üçün keyfiyyətli inklüziv təhsilin genişləndirilməsi” layihəsi çərçivəsində görüş

Sentyabrın 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Avropa İttifaqının maliyyə dəstəyi ilə həyata keçiriləcək və UNİCEF tərəfindən Təhsil Nazirliyi ilə tərəfdaşlıq şəraitində icra ediləcək “Azərbaycanda əlilliyi olan uşaqlar üçün keyfiyyətli inklüziv təhsilin genişləndirilməsi” layihəsi çərçivəsində görüş keçirilib. Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin dekanı, dosent Şəhla Əliyeva, Korreksiyaedici təlim kafedrasının müdiri, dosent Nailə Hüseynova, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi Lətif Kəngərlinski, UNİCEF-in təhsil proqramı üzrə koordinatoru Leyla Həsənova, layihə çərçivəsində kadr hazırlığı üzrə UNİCEF-in beynəlxalq eksperti Peter Grimes və başqaları iştirak ediblər.



Rektor Cəfər Cəfərov qonaqları rəhbərlik etdiyi ali təhsil müəssisəsində görməkdən məmnunluq duyduğunu bildirib. Qeyd edib ki, ADPU-nun müasir universitet səviyyəsinə gətirilməsi üçün beynəlxalq əlaqələrinin genişləndirilməsi, xarici layihələrdə iştirak etməsi olduqca vacibdir. ADPU-nun inklüziv təhsil sahəsində müvafiq təcrübəsi, potensialı və mütəxəssisləri var. Layihənin səmərəli işləməsi üçün görülən işlərin nəzərdən keçirilməsi, təhlillərin aparılması məqsədəuyğundur. ADPU bu layihəyə dəstək verməyə hazırdır.

UNİCEF-in təhsil proqramı üzrə koordinatoru Leyla Həsənova görüşə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib və bildirib ki, görüşün keçirilməsində məqsəd layihənin icrası zamanı nəzərdə tutulan tədbirlərin detallarını müzakirə etməkdir.

Layihə çərçivəsində kadr hazırlığı üzrə UNİCEF-in beynəlxalq eksperti Peter Grimes çıxış edərək bildirib ki, ötən il Azərbaycanda sağlamlıq imkanları məhdud olan uşaqların təhsili, onlarla davranış qaydaları və ehtiyaclarının öyrənilməsi ilə bağlı tədqiqat aparılıb. Mövcud vəziyyət öyrənilib, qarşıda duran vəzifələr müəyyən edilib. İnklüziv təhsil fərqli, xüsusi bir təhsildir və keyfiyyətli təhsillə eyni məzmuna malikdir. Ali və orta təhsil sahəsində bu işin vahid şəkildə aparılması vacibdir. “Azərbaycanda əlilliyi olan uşaqlar üçün keyfiyyətli inklüziv təhsilin genişləndirilməsi” layihəsinin məqsədi bu sahədə çalışan müəllimlərə dəstək verməkdir. Layihə bütün tərəfdaşlarla birlikdə açıq, şəffaf, müzakirə şəraitində icra olunacaq, mövcud vəziyyət nəzərə alınaraq konkret nəticələrin əldə edilməsi hədəf kimi müəyyən ediləcək. Layihənin icrası zamanı 100-ə yaxın ustad-təlimçilər hazırlanacaq və onlar sınaqdan keçiriləcək. Layihə müəllimlərin bilik və bacarıqlarını və təhsilin keyfiyyətini əhəmiyyətli dərəcədə yaxşılaşdıracaq. Layihə çərçivəsində ADPU-nun da 5 nəfər müəlliminin daxil olduğu İşçi qrupu yaradılacaq. ADPU bu prosesdə xüsusi yer tutur.

Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov inklüziv təhsil və yenidənhazırlanma təhsili sahəsində tədris planlarının hazırlanmasında ADPU-ya qabaqcıl beynəlxalq təcrübəyə uyğun dəstək verilməsinin vacibliyini vurğulayıb.

Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin dekanı, dosent Şəhla Əliyeva, Korreksiyaedici təlim kafedrasının müdiri, dosent Nailə Hüseynova, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi Lətif Kəngərlinski çıxış edərək layihənin mühüm və uğurlu olduğunu bildiriblər.

**Orxan Abdullayev**

# Elmi Şuranın iclası

Sentyabrın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının 2018-2019-cu tədris ili üçün ilk iclası keçirilib. ADPU-nun rektoru, Elmi Şuranın sədri, professor Cəfər Cəfərov iclası giriş sözü ilə açaraq Şura üzvlərini yeni tədris ili münasibətilə təbrik edib, onlara elmi-pedaqoji fəaliyyətlərində uğurlar arzulayıb. Rektor bildirib ki, iclasın gündəliyinə yaz və yay semestrlərinin imtahan sessiyasının nəticələri və yeni tədris ilində qarşıda duran vəzifələr haqqında, ADPU-da 2018-2019-cu tədris ili üçün tələbə qəbulunun nəticələri haqqında və cari məsələlər daxildir.

Rektor Cəfər Cəfərov çıxışında qeyd edib ki, bu il pedaqoji təhsilə dair nəticələr ürəkaçandır. Bu nəticələr Təhsil Nazirliyinin son günlər keçirdiyi iki tədbirdə də xüsusi vurğulanıb. Təhsil naziri Ceyhun Bayramov bildirib ki, bu yaxınlarda “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın qəbul edilməsinin 5 ili tamam olacaq. Bu müddət ərzində məktəbəqədər təhsilin əhatə dairəsi genişlənib, uşaqların vaxtında məktəbə getmələri nizama salınıb, məktəbə qəbul elektron qeydiyyat vasitəsilə aparılıb. Ali təhsil müəssisələrinə qəbulda müsbət dinamika müşahidə edilib. Bu müsbət dinamika özünü həm kəmiyyət, həm də keyfiyyət baxımından göstərir. Cəmiyyətdə müəllim peşəsinin ictimai nüfuzu artıb. Müəllim peşəsinə marağın artmasında müəllimlərin bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsinin keçirilməsi, onların əməkhaqlarının artırılması, məktəblərin madditexniki bazasının gücləndirilməsi, müəllimlərin işə qəbulunda şəffaflığın və obyektivliyin təmin edilməsi böyük rol oynayıb. 2018-2019-cu tədris ilində ali məktəblərə 41 min nəfər tələbə qəbul olunub. 500-dən yüksək bal toplayan 2090 nəfər gənc müəllimlik peşəsini seçib. ADPU-ya bu il filiallarla birlikdə 566 nəfər gənc 500-dən çox bal toplayaraq qəbul olunub. Cari tədris ilində 500-dən çox bal toplayan 129 gənc ADPU-nun “İbtidai sinif müəllimliyi” ixtisasını seçib. Filiallarla birlikdə 15 nəfər gənc 600-dən çox bal toplayaraq təhsil almaq üçün ADPU-nu seçib. Müqayisə üçün qeyd edək ki, ötən il filiallarla birlikdə 3 nəfər 600-dən çox bal toplayaraq ADPU-ya qəbul olunub.

Təhsil Nazirliyi tərəfindən yeni tədris ilinin prioritetləri müəyyən edilib. Yeni tədris ilində yeni qəbul qaydaları tətbiq ediləcək, xarici dillərin öyrənilməsinə, şagirdlərin dərs yükünün yüngülləşməsinə, onların hərtərəfli inkişafına, istedadlı şagirdlərin üzə çıxarılmasına, vətənpərvərlik və vətəndaşlıq hisslərinin gücləndirilməsi məqsədilə keçirilən tədbirlərin mənalı və məzmunlu təşkil edilməsinə, sağlam həyat tərzinə, təhsilin keyfiyyətinə nəzarətə xüsusi önəm veriləcək. Eyni zamanda ali təhsil müəssisələrinin ölkədaxili inteqrasiyası, Boloniya sisteminin prinsiplərinə düzgün əməl edilməsi, tyutor xidməti, ingilisdilli proqramlar diqqət mərkəzində saxlanılacaq.




Biz fəaliyyətimizi bu müsbət dinamika əsasında qurmalı, təhsil xidmətlərimizi müasir əmək bazarının sürətlə dəyişən və artan tələblərinə uyğun şəkildə təşkil etməliyik. Məqsədimiz ADPU-nun müasir beynəlxalq tələblərə cavab verən ali təhsil müəssisəsi olmasıdır.

Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov yaz və yay semestrlərinin imtahan sessiyasının nəticələri və yeni tədris ilində qarşıda duran vəzifələr haqqında məlumat verib. Dosent E.Aslanov bildirib ki, imtahan sessiyasının keçirilməsi barədə müvafiq əmr imzalanıb. 2017-2018-ci tədris ilində universitetdə bütün aralıq qiymətləndirmələr, semestr və dövlət imtahanları Tədris Departamentinin İmtahan və monitorinq şöbəsi tərəfindən həyata keçirilib və vahid mərkəzdən idarə olunub. Semestr və həmçinin dövlət imtahanlarında mütəşəkkilliyin təmin olunması məqsədilə mərkəzin ümumi təşkilatçılığı və koordinatorluğu ilə universitet üzrə 30 nəfər təşkilatçı, o cümlədən 100 nəfər nəzarətçi əməkdaşdan ibarət İmtahan Qrupu yaradılıb və bütün imtahanların təşkili və imtahanlarla əlaqəli bütün funksiyaların icra edilməsi bu qrupa həvalə edilib.

Bütövlükdə imtahan sessiyası şəffaf və obyektiv keçirilib, vaxtında yekunlaşıb. Apelyasiya Komissiyasına və İmtahan Qərargahına edilən müraciətlər çevik şəkildə, qanun çərçivəsində araşdırılıb, müvafiq qərarlar qəbul edilib.

Dosent E.Aslanovun hesabat məruzəsində ADPU və filiallarında, həmçinin ADPU-nun nəzdində ADPK-də yaz və yay semestrlərinin imtahan sessiyasının nəticələri konkret rəqəmlər əsasında öz əksini tapıb.

Elmi Şura dosent E. Aslanovun hesabatını qəbul edib.

Sənəd Qəbulu Komissiyası üzrə məsul şəxs, professor İbrahim Bayramov ADPU-ya 2018-2019-cu tədris ili üçün tələbə qəbulunun nəticələri haqqında məlumat verib. Qeyd edib ki, ADPU-ya ali təhsilin bakalavriatura səviyyəsində 8 fakültə, 22 ixtisas üzrə Azərbaycan bölməsinə 2035, rus bölməsinə isə 190 yer olmaqla 2225 plan yeri ayrılıb. Bu, ötən tədris ilinin qəbul planından 25 nəfər çoxdur. 2018-2019-cu tədris ilində bakalavriat səviyyəsində Azərbaycan bölməsinə 2013 nəfər, rus bölməsinə 153 nəfər tələbə olmaqla 2166 nəfər tələbə qəbul olunub. Bu da qəbul planının 97,3 faizini təşkil edir. ADPU-ya qəbul olunan 2166 nəfər tələbənin 936 nəfərini dövlət sifarişi əsasında, 1230 nəfərini isə ödənişli əsaslarla qəbul olunanlar təşkil edir.

ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinə (ADPK) 9 illik təhsil əsasında 7 ixtisas üzrə 699 nəfər tələbə, 11 illik təhsil əsasında 6 ixtisas üzrə 452 nəfər tələbə qəbul olunub. Ümumilikdə ADPK-ya 1151 nəfər tələbə qəbul olunub.

Son illər yüksək bal toplayan abituriyentlər arasında davamlı olaraq ölkəmizdə müəllim hazırlığının əsas mərkəzi hesab edilən ADPU-nu seçənlərin sayı artıb. Belə ki, 2014-2015-ci tədris ilində ADPU-ya qəbul olunmuş tələbələrdən cəmi 20 nəfəri 500-dən çox bal topladığı halda, 2017-2018-ci tədris ilində 273 nəfər, bu il isə 527 nəfər ADPU-da təhsil almaq arzusunu gerçəkləşdirib. Bu da 5 ildə təxminən 27 dəfə, 1 il ərzində isə 2 dəfə artım deməkdir. Builki tədris ilində 11 nəfər 600-dən çox bal toplayaraq ADPU-ya qəbul olunub.

2018-2019-cu tədris ilində ADPU-ya ali təhsilin magistratura səviyyəsində 17 ixtisas, 18 ixtisaslaşma üzrə 286 nəfər qəbul olunub. Onlardan 106 nəfəri dövlət sifarişi əsasında, 180 nəfəri isə ödənişli əsaslarla qəbul olunub. Magistraturaya qəbul planı 86,6% olub.

Məlumat üçün onu da qeyd edək ki, bu il ADPU-nun SABAH qruplarına 2 ixtisas - “İbtidai sinif müəllimliyi” ixtisası üzrə 25 nəfər tələbə, “Riyaziyyat və informatika müəllimliyi” ixtisası üzrə isə 20 nəfər tələbə qəbul olunub.

ADPU-nun Şəki Filialına 8 ixtisas üzrə 189 nəfər, Quba Filialına 6 ixtisas üzrə 181 nəfər, Ağcabədi Filialına 5 ixtisas üzrə 133 nəfər, Şamaxı Filialına 5 ixtisas üzrə 118 nəfər, Cəlilabad Filialına 4 ixtisas üzrə 121 nəfər qəbul olunub. Filiallara 742 nəfər tələbə qəbul olunub. Bütövlükdə ADPU-ya filiallar, SABAH qrupları və kolleclə birlikdə 4104 nəfər tələbə qəbul olunub.

ADPU-nun 5 filialı üzrə 35 nəfər 500-dən çox, 4 nəfər isə 600-dən çox bal toplayıb.

Elmi Şura professor İ. Bayramovun hesabatını qəbul edib.

Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov, Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev cari məsələləri, Elmi katib, siyasi elmlər üzrə fəlsəfə doktoru Asif Axundov Elmi Şuranın iclasında qəbul edilən qərarları, Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov reytinq qiymətləndirilməsi ilə bağlı görülən işləri Elmi Şura üzvlərinin diqqətinə çatdırıblar. Cari məsələlər müzakirə edilib və müvafiq qərarlar qəbul olunub.

**Mahirə Mustafayeva**

# 2018-2019-cu tədris ilinin başlanması münasibətilə tədbir

Sentyabrın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 2018-2019-cu tədris ilinin başlanması münasibətilə tədbir keçirilib. Tədbirdə əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbiri giriş sözü ilə açaraq universitetə qəbul olunmuş I tədris ili tələbələrini və onların valideynlərini təbrik edib, gənclərə həyatda və təhsildə uğurlar arzulayıb.

Rektor Cəfər Cəfərov çıxışında bildirib ki, müəllimlik müqəddəs, şərəfli və məsuliyyətli peşədir. Cəmiyyətin, ölkənin inkişafında müəllimin rolu əvəzsizdir. "Təhsil millətin gələcəyi, müstəqil dövlətin təməlidir!" söyləyən ümummilli liderimiz Heydər Əliyev müəllim peşəsini yüksək qiymətləndirərək demişdir: "Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram".

Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev elm və təhsilə böyük diqqət və qayğı göstərir. Azərbaycanda təhsil sahəsinin inkişafı ölkəmizin ümumi inkişaf strategiyasının tərkib hissəsinə çevrilmişdir. Ölkə rəhbərliyi müəllim hazırlığına xüsusi diqqət yetirir.

Azərbaycanın Birinci vitse-prezidenti Mehriban xanım Əliyeva elm və təhsilin inkişafında sanballı xidmətlər göstərir. Milli mədəni irsimizin böyük qayğıkeşi olan Mehriban xanım Əliyevanın çoxşaxəli fəaliyyətinin əsas istiqamətlərindən birini məhz təhsilə diqqət və qayğı təşkil edir.

Rektor çıxışında vurğulayıb ki, yeni tədris ili respublikamızın böyük və tanınmış ali təhsil müəssisələrindən biri olan ADPU-nun kollektivi üçün yüksək göstəricilərlə başlayıb. Bu il ADPU-ya filiallar, SABAH qrupları və kolleclə birlikdə 4104 nəfər tələbə qəbul olunub. Xüsusi qeyd etmək lazımdır ki, son illər yüksək bal toplayan abituriyentlər arasında davamlı olaraq ölkəmizdə müəllim hazırlığının əsas mərkəzi hesab edilən ADPU-nu seçənlərin sayı artıb. Belə ki, 2014-2015-ci tədris ilində ADPU-ya qəbul olunmuş tələbələrdən cəmi 20 nəfəri 500-dən çox bal topladığı halda, 2017-2018-ci tədris ilində 273 nəfər, bu il isə 527 nəfər 500-dən çox bal toplayıb. Builki tədris ilində filiallarla birlikdə 15 nəfər 600-dən çox bal toplayaraq ADPU-ya qəbul olunub.





ADPU-nun 5 filialı üzrə 35 nəfər 500-dən çox, 4 nəfər isə 600-dən çox bal toplayıb. Bütövlükdə bu il ADPU-ya filiallarla birlikdə 500-dən çox bal toplayaraq qəbul olunan tələbələrin sayı 566 nəfərə çatıb. Əvvəliki illərlə müqayisədə bu rəqəmlər çox yüksək göstəricilərdir. ADPU özünün inkişaf dövrünü yaşayır. Biz təhsilin keyfiyyətinin yüksəldilməsi və ölkəmiz üçün müasir tələblərə cavab verən pedaqoji kadrların hazırlanması üçün daha əzmlə çalışmalıyıq. Qoy yeni tədris ili yeni uğurlar, yeni sevinclər gətirsin!

Tədbirdə Kimya və biologiya fakültəsinin "Kimya və biologiya müəllimliyi" ixtisasına 648 balla qəbul olunmuş Afət Sadıqova çıxış edərək yaxşı təhsil alacaqlarını və yüksək səviyyəli mütəxəssislər kimi yetişəcəklərini bildirib.

Tədbirdə universitetə yüksək balla qəbul olunmuş gənclərə tələbə biletləri təqdim edilib.

**Nurlan Səmədov**



# ADPU Van Yüzüncü İl Universiteti ilə əməkdaşlıq edəcək

Sentyabrın 13-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov Türkiyə Respublikasının Van Yüzüncü İl Universitetinin rektoru, professor Peyami Battal və prorektoru, professor Ahmed Kazankaya ilə görüşüb. Görüşdə ADPU-nun Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, İnzibati və iqtisadi işlər üzrə prorektoru Ümid Mehdiyev, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi Günay Məhərrəmova da iştirak ediblər.



Qonaqları rəhbərlik etdiyi ali təhsil müəssisəsində görməkdən məmnunluq duyduğunu bildirən rektor Cəfər Cəfərov onlara ADPU haqqında ətraflı məlumat verib. Qeyd edib ki, 1921-ci ildə yaradılan ADPU ölkəmizin ilk anadilli universiteti olmuşdur. Fəaliyyət göstərdiyi müddət ərzində ADPU 150 mindən çox pedaqoji kadr hazırlayıb, ölkəmizdə elm və təhsilin inkişafında böyük xidmətlər göstərib. AMEA-nın 10 prezidentinin 3-ü və 3 vitse-prezidenti ADPU-nun məzunları olub. 3 il bundan öncə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin müvafiq Sərəncamı ilə Azərbaycan Müəllimlər İnstitutu filialları ilə birlikdə ADPU-ya qoşulub. ADPU-nun 5 filialı var. Tədris Bakı şəhərində 4 binada aparılır. Ölkəmizin ən böyük orta ixtisas təhsili müəssisəsi olan Azərbaycan Dövlət Pedaqoji Kolleci ADPU-nun nəzdində fəaliyyət göstərir. ADPU-da təxminən 18 minə yaxın tələbə təhsil alır. Son illər ölkəmizdə müəllim peşəsinə maraq xeyli artıb. Builki tələbə qəbulu prosesi də bunu bir daha təsdiqləyir. Belə ki, bu il 500-dən yüksək bal toplayan 566 nəfər tələbə təhsil almaq üçün ADPU seçib. 3 il bundan öncə isə cəmi 20 nəfər tələbə 500-dən çox bal toplayaraq ADPU-nu seçmişdi. Bu müsbət dinamikaya həm dövlət səviyyəsində, həm də universitetdə həyata keçirilən əməli tədbirlər nəticəsində nail olunub. ADPU artıq cəlbedici bir ali təhsil müəssisəsinə çevrilib. Universitetdə təhsilin keyfiyyətinin yüksəldilməsi, infrastrukturun yenilənməsi sahəsində islahatlar davam etdirilir.

Van Yüzüncü İl Universitetinin rektoru, professor Peyami Battal səmimi və mehriban görüşə görə təşəkkür edərək təmsil etdiyi universitet haqqında məlumat verib. Bildirib ki, universitet 1982-ci ildə Türkiyə Respublikasının qurucusu və ilk prezidenti Mustafa Kamal Atatürkün 100 illik yubileyi münasibətilə yaradılıb. Van Yüzüncü İl Universitetinin Türkiyə universitetləri arasında xüsusi yeri və mövqeyi var. Professor Peyami Battal universitetin fəaliyyət istiqamətləri, fakültə və bölümləri, tədris prosesi, professor-müəllim və tələbə heyəti, idarəetmə strukturları barədə geniş danışıb.

Sonra ADPU ilə Van Yüzüncü İl Universiteti arasında ikitərəfli əməkdaşlıq müqaviləsi və Mövlana Mübadilə Proqramı çərçivəsində protokol imzalanıb. Əməkdaşlıq çərçivəsində imzalanmış sənədlərdə birgə layihələrin həyata keçirilməsi, tələbə və müəllim mübadiləsi və digər məqamlar öz əksini tapıb.

Görüşdə xatirə şəkili çəkdirilib, hədiyyələr təqdim edilib. Sonda rektor Cəfər Cəfərov qonaqları ADPU-nun tədrisi binası ilə tanış edib.

# Türkiyənin nümayəndə heyəti ADPU-da

Türkiyə Respublikasının Anadolu Aydınlar Ocağının başqanı, professor İbrahim Öztəkin başçılıq etdiyi 13 nəfərlik nümayəndə heyəti 17 sentyabr 2018-ci il tarixdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) qonağı olub.



ADPU-nun rektoru, professor Cəfər Cəfərov qonaqları 2018-2019-cu tədris ilinin başlanması günündə salamlamaqdan məmnunluğunu bildirib. Təhsil sahəsindəki uğurlardan, o cümlədən ADPU-nun son illərdəki uğurlarından söz açıb.

Nümayəndə heyətinin TÜRKSOY kafedrası ilə tanışlığı onlarda məmnunluq hissi yaradıb. ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, TÜRKSOY kafedrasının rəhbəri, professor Asəf Zamanov universitetdə ADPU və TÜRKSOY təşkilatı tərəfindən 2017-ci ilin dekabr ayında Azərbaycanda ilk dəfə yaradılmış TÜRKSOY kafedrasının fəaliyyəti barədə qonaqlara məlumat verib. Bu kafedranın da təşkilatçılardan biri olduğu cari ilin iyun ayında ADPU-da keçirilmiş "Türk Kültür Coğrafiyasında Təhsil və Sosial Elmlər" beynəlxalq simpoziumunun türk dünyası üçün əhəmiyyətini vurğulayıb.



Nümayəndə heyətinin rəhbəri, professor İbrahim Öztək, Altay Universitetinin keçmiş rektoru, professor Şərafəttin Canda və digər qonaqlar Türkiyə-Azərbaycan dostluğunun, qardaşlığının tarixi kökləri, gündən-günə daha da inkişafı, perspektivləri barədə fikirlərini bildirərək, yüksək səviyyədə təşkil olunmuş qəbul üçün ADPU-nun rəhbərliyinə təşəkkür ediblər. Sonda xatirə şəkilləri çəkdirilib.

# ABŞ-ın Princeton Universitetinin mütəxəssisi İan Dooley Fulbrayt proqramı çərçivəsində ADPU-da fəaliyyətə başlayıb



Sentyabrın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov Fulbrayt ETA proqramı çərçivəsində universitetdə fəaliyyətə başlayan Princeton Universitetinin mütəxəssisi İan Dooley ilə görüşüb. Universitetin tarixi, aparılan islahatlar haqqında ətraflı məlumat verən rektor Cəfər Cəfərov ali təhsil müəssisəsi kimi qarşıda duran məsələlərə də toxunub. Ekspertin tədris prosesinə cəlbi, ingilis dilində danışıq klublarının təşkil edilməsi, ingilis dilinin tədrisi prosesinin araşdırılması və onun təkmilləşdirilməsinin müzakirəsi, Kitabxana-İnformasiya Mərkəzinin fəaliyyətinin yenidən təşkili, ümumiyyətlə, universitetdə tədrisin keyfiyyətinin artırılmasına yönəlmiş işlərdə iştirakı barədə söhbət açılıb. Ölkəmizdə ilk dəfə səfərdə olan İan Dooley universitet haqqında daha ətraflı məlumat əldə etməyə, qeyd edilən sahələrdə öz bilik və təcrübəsini bölüşməyə hazır olduğunu bildirib.

Qeyd edək ki, Fulbrayt ETA proqramının əsas məqsədi amerikalı universitet məzunlarının ana dili ingilis dili olmayan xaricilərə dərs demək üçün yerli ingilis dili müəllimlərinə kömək etməkdir.

# ADPU-da I tədris ili tələbələri ilə görüş

**Sentyabrın 15-də 2018-2019-cu tədris ilində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya, Riyaziyyat və informatika, Kimya və biologiya, Fizika və texnologiya, Tarix və coğrafiya, İbtidai təhsil, Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq, Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültələrində I tədris ilinə qəbul olunmuş tələbələrlə görüş keçirilib. Görüşün keçirilməsində məqsəd tələbələri təhsil alacaqları fakültə ilə tanış etmək, onları Boloniya prosesi, kredit sistemi, tədris və imtahan prosesi, kitabxanadan istifadə, dərsə davamiyyət və davranış qaydaları, hüquq və vəzifələri, ictimai-mədəni tədbirlərdə iştirakları barədə məlumatlandırmaq olub. Görüşdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, dekan müavinləri, kafedra müdirləri, müəllimlər və tyutorlar iştirak ediblər.**

ADPU-nun prorektorları, fakültə dekanları tələbə-gəncləri universitetə qəbul olunmaları və Bilik Günü münasibətilə təbrik edərək onlara həyatda və təhsildə yeni-yeni uğurlar arzulayıblar. Görüşlərdə xüsusi vurğulanıb ki, peşə, ixtisas seçimi hər bir gəncin həyatında mühüm rol oynayır. Müəllimlik şərəfli, müqəddəs və eyni zamanda məsuliyyətli peşədir. Ölkə rəhbərliyi müəllim hazırlığına xüsusi diqqət yetirir. Azərbaycan cəmiyyətində müəllim peşəsinin ictimai nüfuzu durmadan yüksəlir. 2018-2019-cu tədris ili ADPU-nun kollektivi üçün yüksək göstəricilərlə başlayır. Belə ki, bu il filiallarla birlikdə 500-dən çox bal toplayan 566 nəfər gənc təhsil almaq üçün ADPU-nub ki, ADPU ölkəmizdə pedaqoji kadr hazırlığının mərkəzi hesab edilir. Universitet ölkəmizdə elm və təhsilin inkişafına dəyərli töhfələr verib və hazırda bu istiqamətdə fəaliyyətini davam etdirir. ADPU-nun məzunları bu gün həyatımızın müxtəlif sahələrində uğurla fəaliyyət göstərirlər. Görüşlərdə tələbələrə



nu seçib. Yeni tədris ilində filiallarla birlikdə 15 nəfər gənc 600-dən çox bal toplayaraq ADPU-ya qəbul olunub. Əvvəlki illərlə müqayisədə bu rəqəmlər yüksək göstəricilərdir. ADPU-nun rektoru, professor Cəfər Cəfərovun rəhbərliyi ilə universitetdə təhsilin keyfiyyətinin yüksəldilməsi üçün həyata keçirilən islahatlar öz müsbət nəticəsini verir.

Görüşlərdə ADPU-nun tarixi, keçdiyi böyük inkişaf yolu, şöhrətli məzunları, ölkəmizin ali təhsil sistemindəki yeri və mövqeyi, tədris və imtahan prosesi, universitetdə həyata keçirilən islahatlar barədə tələbələrə ətraflı məlumat verilib. Qeyd olu-

yaxşı təhsil almaq, yüksəkixtisaslı mütəxəssis və fəal vətəndaş olmaq tövsiyə edilib.

Görüşlərdə yüksək balla universitetə qəbul olunmuş tələbələrə hədiyyələr və tələbə biletləri təqdim edilib. Tələbələr çıxış edərək yaxşı oxuyacaqlarını, ölkəmiz üçün yüksək səviyyəli mütəxəssis və əsl vətəndaş kimi yetişmək üçün əzmlə çalışacaqlarını vurğulayıblar.

Görüşlərdə tələbələri və valideynləri maraqlandıran suallar cavablandırılıb, dərs cədvəlləri paylanılıb, həmçinin təhsil alacaqları fakültənin dekanlığı, kafedraları, tədris auditoriyaları və elmi-tədqiqat laboratoriyaları ilə tanış ediliblər.

# Professor Faruk Faik Köprülünün "Kərkük tarixi və Türkmən eli mədəniyyətindən səhifələr" mövzusunda məruzəsi

**Sentyabrın 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) tədqiqatçı- alim, professor, şair Faruk Faik Köprülünün "Kərkük tarixi və Türkmən eli mədəniyyətindən səhifələr" mövzusunda məruzəsi dinlənilib. Tədbirdə ADPU-nun rəhbərliyi, Tarix və coğrafiya fakültəsinin və Filologiya fakültəsinin professor-müəllim heyəti, doktorantları, magistrləri və tələbələri iştirak ediblər.**



ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbiri giriş sözü ilə açaraq bildirib ki, bu gün universitetin həyatında əlamətdar bir gündür. Bu gün bizim xüsusi qonağımız var. Professor Faruk Faik Köprülü Türk dünyasının böyük alimi, vətənpərvər ziyalısıdır. Çıxışında professor Faruk Faik Köprülünün həyat və fəaliyyəti haqqında məlumat verən rektor bildirib ki, Türkmən eli mədəniyyətinin qurucularından, araşdırmaçılarından olan professor Faruk Faik Köprülü 1953-cü ildə Kərkük mahalının Altınkörpü qəsəbəsində anadan olub. 1974-cü ildə Bağdad Universitetinin Təhsil fakültəsinin ərəb bölməsini bitirib. Əmək fəaliyyətinə Kərkükdə orta məktəbdə müəllim işləməklə başlayıb. 2004-cü ildən türk məktəbində fənnbirləşməsi rəhbəri olub, İraq-Türkmən məktəbinin tədrisinə rəhbərlik edib.

Gənc yaşlarından ədəbiyyatla məşğul olmağa başlayıb. Bədii yaradıcılığa şeir yazmaqla başlayıb. Sonradan öz yüksək məzmunlu yazıları ilə Türkmən ədəbiyyatçıları sırasına qoşulub. Bağdaddakı Türkmən radiosunda ədəbiyyat və folklor proqramlarını hazırlayaraq təqdim edib. 35 ildən çoxdur ki, "Türkmən eli" proqramının aparıcısıdır. Elmi və mədəni fəaliyyəti ilə İraq Türkmən mədəniyyətinə böyük xidmətlər göstərib. Bir çox beynəlxalq konfransların iştirakçısı olub. İraq Xəttatlar Dərnəyinin, Türkmən Xalq Şairləri Dərnəyinin, İraq Ədəbiyyatçılar Birliyinin və digər yaradıcı təşkilatların üzvüdür. Ərəb və türk dillərində 50-dən çox kitabın müəllifidir. Bu kitablardan 6-nı Azərbaycana həsr edib. Azərbaycan Yazıçılar Birliyinin fəxri üzvüdür. Mərkəzi Azərbaycanda olan Beynəlxalq Vektor Elm Mərkəzi tərəfindən fəxri doktor adına layiq görülüb. Professor Faruk Faik Köprülü həmçinin "Qızıl ulduz" medalı ilə təltif edilib. "Kərkükdən Bakıya şahin uçurtdum" adlı son kitabı 4 ay bundan öncə çap olunub. Belə görüşlər xalqlarımız arasında əlaqələrin güclənməsinə səmərəli təsir göstərir.

Professor Faruk Faik Köprülü çıxışında öncə görüşün keçirilməsində əməyi olan hər kəsə təşəkkür edib və universitetin kollektivinə uğurlar arzulayıb. Faruk Faik Köprülü qeyd edib ki, Kərkük vilayəti İraqın ən önəmli bir hissəsidir. Kərkük vilayətinin coğrafi mövqeyi, İraq türkmənlərinin tarixi, etimologiyası, ədəbiyyatı, mədəniyyəti haqqında məlumatlar məruzədə öz geniş əksini tapıb. İraqda Azərbaycanın böyük şair və mütəfəkkirləri İmadəddin Nəsiminin, Məhəmməd Füzulinin məzarları var. Məruzəçi vurğulayıb ki, İraq türkmənləri qarşılaşdıqları çətinliklərə, məhrumiyyətlərə, soyqırımlara baxmayaraq öz milli varlıqlarına, bayraqlarına, mənəvi-əxlaqi dəyərlərinə sadiq qalıblar. İraq türkmənləri mədəni, səbirli, müdrik, sülhsevər millətdirlər. Xalq şeiri xalqın ruhunun, mənəviyyatının, düşüncələrinin, həyat tərzinin ifadəsidir. Görkəmli alim, professor Qəzənfər Paşayev İraq türkmənlərinin folklorunun Azərbaycanda, eləcə də Azərbaycan folklorunun İraq türkmənləri arasında yayılmasında əvəzsiz xidmətlər göstərib.

Görüşdə çıxış edən dosent Şahin Pənahov, professor Buludxan Xəlilov, professor Elman Quliyev, professor Təyyar Cavadov, dosent Naibə Əhmədova, filologiya üzrə elmlər doktoru Kamil Bəşirov, tarix üzrə fəlsəfə doktoru Mübariz Ağalarov görüşün keçirilməsindən məmnun qaldıqlarını bildirərək Türk xalqları arasında əlaqələrin daha da genişləndirilməsi ilə bağlı fikir və təkliflərini bölüşüblər.

Professor Faruk Faik Köprülü görüşdə öz şeirlərini oxuyub, iştirakçıların suallarını cavablandırıb.

Sonda hədiyyələr təqdim edilib, xatirə şəkli çəkdirilib.

## ADPU ilə Atatürk Universiteti arasında Mövlana Mübadilə Proqramı çərçivəsində protokol imzalanıb

Sentyabrın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov Türkiyə Respublikasının Atatürk Universitetinin rektoru, professor Ömər Çomaklı ilə görüşüb. Görüşdə ADPU-nun Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, ADPU rektorunun köməkçisi Riyad Rüstəmli, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi Lətif Kəngərli və digər şəxslər iştirak ediblər.



Rektor Cəfər Cəfərov qonaqları salamlayaraq onlara ADPU haqqında ətraflı məlumat verib. Qeyd edib ki, ADPU 1921-ci ildə yaradılıb. ADPU fəaliyyət göstərdiyi müddət ərzində elm və təhsilin inkişafında misilsiz xidmətlər göstərib. ADPU-da 18 minə yaxın tələbə təhsil alır. Tədris Bakı şəhərində 4 binada aparılır. ADPU-nun 5 filialı var. Azərbaycan Dövlət Pedaqoji Kolleci ADPU-nun nəzdində fəaliyyət göstərir. ADPU 100 illik yubileyinə yaxınlaşır.

Son illər ölkəmizdə müəllim peşəsinə maraq xeyli artıb. 2018-2019-cu tədris ilində 2090 nəfər abituriyent 500-dən yüksək bal toplayaraq müəllim peşəsini seçib. Bu, əvvəlki illərlə müqayisədə çox böyük göstəricidir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev son çıxışlarının birində bu faktı xüsusi vurğulayıb. Bu il 500-dən yüksək bal toplayan 566 nəfər gənc təhsil almaq üçün ADPU-nu seçib. 3 il bundan öncə isə cəmi 20 nəfər gənc 500-dən çox bal toplayaraq ADPU-nu seçmişdi. Universitetdə təhsilin keyfiyyətinin yüksəldilməsi sahəsində islahatlar davam etdirilir. Son vaxtlar müxtəlif media qurumlarının nüfuzlu təhsil ekspertləri ilə birgə apardıqları sosioloji sorğuların nəticələrinə əsasən ADPU təhsilin keyfiyyətinə və idarəetməyə görə qabaqcıl universitetlərdən biri olub.

Atatürk Universitetinin rektoru, professor Ömər Çomaklı səmimi və mehriban görüşə görə təşəkkür edərək rəhbərlik etdiyi universitetin fəaliyyət istiqamətləri, fakültələri, tədris və elmi həyatı, professor-müəllim və tələbə heyəti, idarəetmə strukturları barədə geniş danışıb.

Sonra ADPU ilə Atatürk Universiteti arasında Mövlana Mübadilə Proqramı çərçivəsində protokol imzalanıb. İmzalanmış sənəddə birgə layihələrin həyata keçirilməsi, tələbə və müəllim mübadiləsi və digər məqamlar öz əksini tapıb.

Görüşdə xatirə şəkili çəkdirilib, hədiyyələr təqdim edilib. Sonda rektor Cəfər Cəfərov qonaqları ADPU-nun tədrisi binası ilə tanış edib.

## "Mağjan Cumabay- 125" elmi-praktik konfransı

Sentyabrın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) və Beynəlxalq Türk Mədəniyyəti Təşkilatı-TÜRKSOY-un birgə təşkilatçılığı ilə universitetdə böyük qazax şairi Mağjan Cumabayın 125 illik yubileyinə həsr olunmuş "Mağjan Cumabay- 125"elmi-praktik konfransı keçirilib. Konfransda ADPU-nun rəhbərliyi, TÜRKSOY-un nümayəndələri, Filologiya fakültəsinin müəllim və tələbələri, ölkəmizin tanınmış və nüfuzlu alim-mütəxəssisləri iştirak ediblər.





Qeyd edək ki, TÜRKSOY tərəfindən 2018-ci ilin "Mağjan Cumabay İli" elan edildiyini, həmçinin ADPU-nun TÜRKSOY kafedrasının fəaliyyət planını nəzərə alaraq universitetin rektoru, professor Cəfər Cəfərov "Mağjan Cumabay- 125"elmi-praktik konfransının keçirilməsi barədə müvafiq əmr imzalayıb. Həmin əmrə əsasən konfransın yüksək səviyyədə keçirilməsi məqsədilə 5 nəfərdən ibarət Təşkilat Komitəsi yaradılıb.

Konfransı giriş sözü ilə açan rektor Cəfər Cəfərov bildirib ki, bu gün ADPU-nu həyatında əlamətdar bir gündür. ADPU qardaş xalqlar arasında əlaqələrin genişləndirilməsi sahəsində də səmərəli fəaliyyət göstərir. Belə tədbirlər Türk dünyasının inteqrasiyasına və türkdilli xalqların bir-birini yaxından tanımalarına xidmət edir. Mağjan Cumabayı Azərbaycanın böyük istiqlal şairi Əhməd Cavadla müqayisə edirlər. O, eyni zamanda Qazaxıstanda pedaqoji kadrların hazırlanmasında, maarifçilik hərəkatında fəal iştirak edib.

TÜRKSOY-un Baş katibinin müavini Fırat Purtaş, Şimali Qazaxıstan Vilayətinin İcra Hakimiyyətinin Dillərin İnkişafı üzrə İdarəsinin rəhbəri Kemel Ospanov, ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, TÜRKSOY kafedrasının rəhbəri, professor Asəf Zamanov, Filologiya fakültəsinin dekanı, TÜRKSOY kafedrası rəhbərinin müavini, professor Buludxan Xəlilov, BDU-nun professoru Ramiz Əskər və başqaları çıxış edərək Mağjan Cumabayın bütün Türk dünyasının vətənpərvər şairi, milli düşüncəli, istiqlal duyğulu ziyalısı olduğunu vurğulayıblar.



Konfransda Şimali Qazaxıstan Dövlət Universitetinin professoru Zarxın Tarşıbay "Mağjan Cumabayın həyatı və yaradıcılığı" mövzusunda məruzə ilə çıxış edib. Professor Zarxın Tarşıbay bildirib ki, Mağjan Cumabay 1893-cü ildə anadan olub.1905-1910-cu illərdə Petropavl mədrəsəsində təhsil alıb, ərəb, fars və türk dillərini öyrənib. 1911-ci ildə isə Ufa mədrəsəsində təhsil alıb. Bu mədrəsədə təhsil alan zaman onun müəllimlərindən biri Volqa tatarlarının klassik yazıçısı Galimcan İbrahimov olub. Şairin 1912-ci ildə qazax dilində olan şeirləri "Şolpan" adlı kitabda toplanaraq nəşr edilib. Bu kitab qazax ziyalıları arasında məşhurluq qazanıb. 1917-ci ildə qazax "Alaş" partiyasının və Alaş Orda Qazaxıstan milli hökumətinin yaranmasında iştirak edib. Sonra Moskvada yaşayıb, Lermontov Koltsov, Balmont, İvanov, Mamin-Sibiryak, Maksim Qorki, Aleksandr Blok, Höte və digər şairlərin əsərlərini qazax dilinə tərcümə edib. Ali təhsilini başa vurduqdan sonra Qazaxıstana qayıdıb və müəllim işləyib.

Haqsız yerə həbs olunaraq 10 il müddətinə azadlıqdan məhrum edilib. 1934-cü ildə Maksim Qorkiyə və Peşkovaya məktub yazaraq onların köməyi ilə həbsdən vaxtından əvvəl azad edilib. Lakin sonra yenidən həbs edilib və 1938-ci ildə güllələnib. Mağjan Cumabay qazax ədəbiyyatının önəmli və məşhur simalarından biridir. O, müasir qazax ədəbiyyatının yaradıcılarındandır. Mağjan Cumabayın əsərləri qazax xalqının mənəvi-mədəni inkişafına səmərəli təsir göstərib. Qazax xalqı onun xatirəsini əziz tutur.

Konfransda Mağjan Cumabayla bağlı film nümayiş olunub, hədiyyələr təqdim edilib, Filologiya fakültəsi tələbələrinin şairin şeirləri əsasında hazırladıqları ədəbi-bədii kompozisiya təqdim edilib, xatirə şəkli çəkdirilib.

Elm və innovasiyalar üzrə prorektor, TÜRKSOY kafedrasının rəhbəri, professor Asəf Zamanov yekun sözü ilə çıxış edərək konfransın ərsəyə gəlməsində əməyi olan hər kəsə təşəkkür edib və uğurlar arzulayıb.

## Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin Elmi Şurasının iclası

Sentyabrın 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin Elmi Şurasının geniş tərkibdə iclası keçirildi. Gündəlikdə olan məsələlər - 2017-2018-ci tədris ilinin yaz semestrinin imtahan sessiyasının nəticələri, 2018-2019-cu tədris ilinə hazırlığın vəziyyəti, yeni dərs ilində fakültə qarşısında duran vəzifələr barədə fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva məruzə edərək əməkdaşları ətraflı məlumatlandırdı. 2018-2019-cu tədris ili üçün fakültə Elmi Şurasının iş planı, 2018-2019-cu tədris ili üçün dekanlığın illik iş planı və digər normativ sənədlər müzakirə olunaraq təsdiq edildi.



Cari məsələlərlə Elmi Şura üzvlərini Elmi Şuranın katibi, dosent Simnarə Heydərova tanış etdi. Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının dosenti Pərişan Həsənovanın hazırladığı dərs vəsaiti və baş müəllim Sona Əliyevanın hazırladığı metodik vəsaitin çap olunması məsləhət bilindi.

İclasda dekan müavini, dosent Allahyar İmanov çıxış etdi. Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, professor Müseyib İlyasov, Yaş və pedaqoji psixologiya kafedrasının müdiri, professor Ərəstun Baxşəliyev, Ümumi psixologiya kafedrasının müdiri, professor Ramiz Əliyev və Korreksiyaedici təlim kafedrasının müdiri, dosent Nailə Hüseynova kafedraların yeni tədris ilinə hazırlığının vəziyyəti ilə əlaqədar ətraflı məlumat verdilər. Fakültə əməkdaşlarından Ümumi psixologiya kafedrasının dosenti Lamiyə Qurbanova, Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının baş müəllimi Sona Əliyeva çıxış edərək müzakirələrdə fəal iştirak etdilər.

## Kimya və biologiya fakültəsinin Elmi Şurasının iclası

Sentyabrın 11-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kimya və biologiya fakültəsinin Elmi Şurasının iclası keçirilib. Kimya və biologiya fakültəsinin dekanı, Elmi Şuranın sədri, dosent Elnarə Mehbalıyeva



Elmi Şura üzvlərini 2018-2019-cu tədris ili münasibətilə təbrik edib və uğurlar arzulayıb, ADPU rəhbərliyinin tapşırıqları haqqında məlumat verib.

Dekanlıq və fakültə Elmi Şurasının Əsasnaməsi və iş planı ilə bağlı fakültənin dekanı, dosent E.Mehbalıyevanın, kafedranın Əsasnaməsi, iş planı, habelə dərs yükü və ştatlar haqqında isə kafedra müdirlərinin məlumatlarının müzakirə olunaraq universitet Elmi Şurasında təsdiq olunması məsləhət bilinib.

Elmi Şurada Buraxılış Yekun Dövlət Attestasiya Komissiyası sədrlərinin hesabatı dinlənilərək qəbul edilib. Bununla da Elmi Şuranın iclası başa çatıb.

## Filologiya fakültəsinin Elmi Şurasının iclası



Sentyabrın 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya fakültəsinin Elmi Şurasının iclası keçirilib. Fakültənin dekanı, Elmi Şuranın sədri, professor Buludxan Xəlilov 2017-2018-ci tədris ilinin yaz semestrinin imtahan sessiyasının nəticələri və 2018-2019-cu tədris ilində görüləcək işlərin əsas istiqamətləri haqqında ətraflı məlumat verib.

Elmi Şurada Filologiya fakültəsinin Elmi Şurasının 2018-2019-cu tədris ili üçün iş planı, akademik təqvimi və fakültənin iş planı təsdiq olunub.

2017-2018-ci tədris ilinin pedaqoji təcrübəsinin yekunlarına dair hesabatla dekan müavini, dosent Pəri Paşayeva çıxış edib.

Sonra fakültənin elmi katibi, dosent Sevinc Sadıxova Elmi Şura üzvlərini cari məsələlərlə tanış edib. Cari məsələlərdə 3 dərs vəsaiti, 3 proqram müzakirə olunub və onların çap olunması, 1 nəfərin dərs vəsaitinin kitabxanaya alınması məqsədəuyğun bilinib.

## İbtidai təhsil fakültəsinin Elmi Şurasının geniş tərkibdə iclası

Sentyabrın 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İbtidai təhsil fakültəsinin Elmi Şurasının geniş tərkibdə iclası



keçirilib. Tədbirdə Elmi Şuranın üzvləri ilə yanaşı, fakültənin müəllimləri iştirak ediblər.

Elmi Şuranı fakültənin dekanı, Elmi Şuranın sədri, Əməkdar elm xadimi, professor Fərrux Rüstəmov açaraq 2017-2018-ci tədris ilinin II yarısının yekunları və qarşıda duran vəzifələrlə bağlı çıxış edib. Qeyd olunub ki, fakültənin elmi-pedaqoji və tədris həyatında xeyli nailiyyətlər əldə edilib, imtahan sessiyasının və Buraxılış Yekun Dövlət Attestasiyasının nəticələri sevindiricidir. Ötən illə müqayisədə həm müvəffəqiyyət, həm də keyfiyyət faizi xeyli yüksəlib. Fakültəyə builki tələbə qəbulunun nəticələri olduqca sevindirici olub, plan yeri dolub. Fakültəyə qəbul olunan 296 nəfər tələbənin 129 nəfəri 500-dən yuxarı bal toplayıb. Bu nəticə respublika mətbuatında və televiziyasında inqilabi nəticə kimi dəyərləndirilib.

Fakültədə nizam-intizam məsələsinə toxunan professor F.Rüstəmov keçən il ərzində dərs əvəzləmələri və boş keçən dərslər haqqında məlumat verib, yeni tədris ilində belə hallara yol verməməyi tələb edib. Bu məsələ ilə bağlı Elmi Şuraya dəvət olunan ADPU-nun baş hüquqşünası Zakir Nağıyev ətraflı danışıb, əməkdaşların suallarını cavablandırıb.

Elmi Şurada İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Yaqut Rzayeva, Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasının müdiri, dosent Samirə Tağıyeva çıxış edərək kafedra əməkdaşlarının elmi-pedaqoji fəaliyyəti haqqında ətraflı məlumat verib. Cari məsələlərin müzakirəsindən sonra professor F.Rüstəmov Elmi Şuranın iclasına yekun vurub.

## Fizika və texnologiya fakültəsinin növbəti elmi seminarı



Sentyabrın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika və texnologiya fakültəsinin növbəti elmi seminarı keçirilib. Seminarda Fizika və texnologiya fakültəsinin professor-müəllim heyəti, Elm və innovasiyalar şöbəsinin müdiri, dosent Yusif Alıyev və fakültənin tələbələri iştirak ediblər.

Seminarı Fizika və texnologiya fakültəsinin dekanı, dosent Arzu Daşdəmirov açaraq seminar iştirakçılarına mövzunun aktuallığı ilə bağlı ətraflı məlumat verərək qeyd edib ki, son zamanlar fiziki materialşünaslıqda bəzi məsələlərin həllində, xüsusilə də, kristallik quruluşların struktur defektlərinin tədqiqində neytron difraksiyası metodundan istifadə olunur. Bu metod digər metodlardan özünün daha informativliyi, kristalın strukturunu zədələmədən daha dəqiqliklə tədqiq oluna bilməsi ilə fərqlənir. Dosent A.Daşdəmirov sonra sözü məruzəçiyə verib.

Seminarda Dubna Birləşmiş Nüvə Tədqiqatları İnstitutunun böyük elmi işçisi, fizika üzrə fəlsəfə doktoru Muxamatulı Bagdaulet “Neytron difraksiyası ilə funksional materialların mikrostrukturunun tədqiqi” mövzusunda məruzə ilə çıxış edib. Seminarda neytron difraksiyası metodu ilə aparılan tədqiqatlar, onların nəticələri təqdim edilib, müasir tədqiqat metodlarından olan neytron tomoqrafiyası və bu metodla arxeoloji, geoloji obyektlərin tədqiq edilməsi ilə bağlı elmi yeniliklərdən danışılıb.

Məruzə bitikdən sonra Fizika və texnologiya fakültəsinin müəllimləri- fizika üzrə elmlər doktorları Xanlar Həsənov, Aydın Ələkbərov, Cahangir Hüseynov, dosent Yusif Alıyev, dosent Əfqan Kərimov və tələbələr məruzəçiyə mövzu ətrafında çoxlu suallar veriblər. Məruzəçi suallara ətraflı cavab verib.

Sonda Fizika və texnologiya fakültəsinin dekanı, dosent A.Daşdəmirov maraqlı və aktual mövzuya həsr olunmuş seminar məruzəsinə görə Dubna Birləşmiş Nüvə Tədqiqatları İnstitutunun böyük elmi işçisi, fizika üzrə fəlsəfə doktoru Muxamatulı Bagdaulet fakültənin professor-müəllim heyəti adından təşəkkürünü bildirib.

## Aktual əhəmiyyətli vəsait




Bu yaxınlarda pedaqogika üzrə elmlər doktoru Həsən Bayramovun pedaqogika üzrə fəlsəfə doktoru Sara Bayramova ilə birgə yazdıqları “Qloballaşma və müasir ailə dəyərləri: ailənin psixoloji və sosial-pedaqoji təsnifatı” adlı aktual əhəmiyyətli metodik vəsaiti nəşr olunmuşdur.

Ailə probleminin nəzərdən keçirilməsinin mühümlüyü bir neçə aspektlə-nikahların sayının və doğuşun aşağı düşməsi, uşaq ölümünün artması, yeni doğulan uşaqların patologiyası, ailədə uşaqların tərbiyəsi ilə bağlı problemlərlə və nəhayət, boşanmalarla, ailədaxili ziddiyyətlərin nəticəsi olaraq intiharlarla izah olunur.

Sosial-demoqrafik dayanıqlıq vəziyyətinin zəifləməsi ailə problemini ictimai müstəvidən iqtisadi, psixoloji və pedaqoji müstəviyə keçirir.

Ailənin yaranması ilə bağlı çoxsaylı amillər arasında ən mühüm rolu nikah, ailənin inkişafı, onun strukturu, ailə üzvləri arasında səlahiyyət bölgüsü, ər-arvad ünsiyyəti, nikah və ailəyə uyğunlaşmaya, nikah portnyorunun seçilməsində həlledici rola malik şərtlər, tərbiyənin müxtəlif formalarının səmərəliliyi, valideynlər və uşaqların psixoloji xüsusiyyətləri, valideynlərin pedaqoji maariflənməsi və s. amillər oynayır. Bundan başqa, əmin-amanlıq, bir-birini qarşılıqlı dərketmə ruhu ailənin mühüm elementlərindəndir.

Hər bir valideyn tərbiyənin məqsəd və vəzifələrini müəyyənləşdirdikdə, uşağın bir vətəndaş, zəhmətkeş, xadim kimi böyüməsi qeydinə qalmağı bacarmalıdır. Valideynlərin hər biri bilməli və yadda saxlamalıdır ki, onlar o zaman ləyaqətli şəxsiyyət yetişdirə bilərlər ki, özlərinin şəxsi nümunəsi arzu olunan səviyyədə olsun. Bu mənada valideynlərin davranışı uşaqlara nümunə kimi son dərəcə böyük təsir göstərir. Göstərilən planda hər bir valideyn özü qarşısında elə tələblər qoymalıdır ki, onların ailəyə hörməti, özlərinin bütün addım və hərəkətləri üzərində nəzarət tərbiyənin başlıca metoduna çevrilmiş olsun.

Uşaqları həddən çox sevmək,təhlükədən qorumaq onları müstəqillikdən məhrum etməməlidir. Əlbəttə, uşaqlar digər uşaqlarla ünsiyyətdə olmalıdırlar. Bundan başqa, ata və ananın öz uşaqlarının harada, kimlərlə bir yerdə oynaması, davranması, hansı işlə məşğul olması barədə aydın təsəvvürləri olmalıdır. Uşaqların daim köməyə ehtiyacı var və bu köməyi valideynlər onlara nəzarət etməklə eyni zamanda yerinə yetirməlidirlər.

Şübhəsiz ki, uşaqların ailə tərbiyəsində ailənin düzgün təşkili mühüm yer tutur və bu işdə heç bir xırdaçıllığa yol vermək olmaz. Çünki burada hər bir hərəkət və söz uşaqlara müsbət, yaxud mənfi təsir göstərir.

Uşağın xarakterinin formalaşmasına, onun valideynləri və ətrafdakılar ilə münasibətinə valideynlər arasında yaranmış qarşılıqlı münasibət formaları xeyli dərəcədə təsir göstərir. Ailədəki qarşılıqlı münasibətlər özünəməxsus mühit yaratmaqla uşaqların xarakterini müəyyənləşdirir, onların digər insanlarla qarşılıqlı münasibətlərini tənzimləyir.

Ailədə tərbiyənin əsas məqsədi Vətəni sevən, xalqına məhəbbət bəsləyən, lazım olduqda onun torpaqlarını müdafiə etməyə, qorumağa ehtiyac duyulursa, hətta canını qurban verməyə hazır olan ləyaqətli vətəndaş tərbiyə etməkdən ibarətdir. Ailə qarşılıqlı qayğı və kömək, inam və etibar, tələbkarlıq və hörmət əsasında qurulmalıdır. Kollektivçilik ailə üzvlərinin davranış normasının ayrılmaz hissəsi olmalıdır. Hamının bir-biri ilə hesablaşdığı və hörmət etdiyi ailələrdə insanların bir-birinə qayğı ilə yanaşması və qarşılıqlı kömək göstərməsi üçün əlverişli şərait yaranır. Belə ailələrdə öz mənafeyini ailə mənafeyinə tabe edən, ailə şərəfini gözləyən uşaqlar böyüyürlər.

Gələcək fəal vətəndaşın, vətənpərvər şəxsiyyətin iradi keyfiyyətlərinin formalaşması ailədə əmək tərbiyəsinə kömək edir və bunun nəticəsində uşaqda təmkinlik, dözümlülük, qoyulmuş məqsədə doğru canatma formalaşır. Bu və digər keyfiyyətlərə malik olan uşaq böyüdükdən sonra əmək qrupuna və birliyə qoşularaq, məqsədi daha tez əldə edib həmkarlarının az bir zamanda nüfuz və hörmətini qazana bilər.

Ailə tərbiyəsinin məzmunu bütün istiqamətləri özündə əhatə edir. Ailədə uşaqların fiziki, estetik, əmək, əqli, mənəvi tərbiyəsi həyata keçirilir və yaş dəyişdikcə tərbiyə işinin forma və məzmunu da dəyişir. İmkan daxilində ailələr və ailəyə yaxın olanlar uşaqlara təbiət, cəmiyyət, istehsalat, peşələr, texnika haqqında biliklər verir, onlarda yaradıcı fəaliyyət və təcrübə formalaşdırır, bəzi intellektual vərdişlər, nəhayət, həyata, dünyaya, insanlara, peşəyə münasibət tərbiyə edirlər.

Ailə tərbiyəsində əsas yeri mənəvi tərbiyə tutur. Bura xeyirxahlıq, böyüklərə, kiçiklərə və zəiflərə qarşı diqqət və rəhmdillik, vicdanlılıq, təvazökarlıq, açıqlıq, əməksevərlik və s. keyfiyyətlərin tərbiyə olunması aiddir. Bəzən buraya itaətkarlığı da əlavə edirlər,lakin itaətkarlığı heç də hamı müsbət xüsusiyyət kimi dəyərləndirib qəbul etmir.

Göründüyü kimi, müasir Azərbaycan ailəsi həm cəmiyyət, həm qanunla mühafizə edilir. O, başlanğıcını ailə ənənələrindən, milli dəyərdən götürməklə, hər bir tarixi mərhələlərin tələblərinə uyğun olarq təkmilləşməklə, özünün əzəli mahiyyətini qoruyur.

Lakin ailə institutunun möhkəmləndirilməsi, qadın və uşaq hüquqlarının müdafiəsi sahəsində vahid dövlət siyasətinin formalaşdırılması və bu siyasətin sistemli şəkildə həyata keçirilməsində xüsusi dövlət təşkilatının yaranmasına ehtiyac vardı. Bu zərurətdən irəli gələrək, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Sərəncamı ilə 2006-cı ildə Ailə, Qadın və Uşaq Problemləri üzrə Dövlət Komitəsi yaradıldı. Bu onu göstərir ki, Azərbaycan Hökuməti ailələrimizin rifahını, qadın iştirakçılığının artırılmasını və uşaqlarımızın sağlam və savadlı böyüməsini daim nəzərində saxlayır, bu isə ölkəmizin daha da güclənməsinə gətirib çıxarır. Eyni zamanda bu Komitənin yaradılması böyük məsuliyyət tələb edirdi. MDB ölkələri arasında yeganə bizim ölkəmizdə belə bir dövlət qurumu var.

Azərbaycanda uşaq məsələlərinə dövlət tərəfindən həmişə diqqət yetirilir və priortet istiqamət təşkil edir. Bildiyimiz kimi, ölkəmizin qoşulduğu ilk beynəlxalq sənədlərdən biri Uşaq Hüquqları haqında Konvensiyasıdır.

Bu baxımdan, Heydər Əliyev Fondunun prezidenti, ölkənin Birinci vitse-prezidenti Mehriban xanım Əliyevanın, eləcə də Fondun vitse-prezidenti Leyla xanım Əliyevanın təşəbbüsləri çox diqqətəlayiqdir.

20 noyabr 1989-cu ildə BMT-nin Baş Assambleyası tərəfindən qəbul edilmiş Uşaq Hüquqları Konvensiyası 54 maddədən ibarətdir. Onların hər biri ayrı-ayrı hüquqlar haqda məlumat verir. Bütün hüquqlar 4 geniş kateqoriyaya bölünə bilər: İnkişaf hüquqları, müdafiə hüquqları, iştirak hüquqları, yaşamaq hüquqları.

Mən kitabın müəlliflərini çoxdan tanıyıram. Həsən müəllim 50 ilə yaxındır ki, pedaqogika müəllimi kimi ali məktəblərdə mühazirələr oxuyur, pedaqogika üzrə elmlər doktorudur. Sara Bayramova da çoxdandır Azərbaycan Dövlət Pedaqoji Kollecində müəllim işləyir, pedaqogika üzrə fəlsəfə doktoru, çoxsaylı məqalələr müəllifidir.

Əsəri oxuduqca həm insan kimi, ziyalı kimi onların zəngin həyat təcrübələrindən qaynaqlanan, həm də pedaqoji-psixoloji müşahidələrinə əsaslanan təklif və tövsiyələri, iradları, narahatlıqları, ən vacibi həyəcan siqnalları maraqla oxunur, aktual əhəmiyyətli məsələ olaraq Azərbaycan ailəsinin mövcud durumu və problemləri haqqında geniş məlumat verilir. Məncə, vəsait geniş pedaqoji ictimaiyyət, xüsusilə tələbələr və müəllimlər üçün çox əhəmiyyətlidir.

**İbrahim Bayramov,**
**filologiya üzrə elmlər doktoru,**
**professor**

## “Azərbaycan gəncliyi 2017-2021 illərdə” Dövlət Proqramının həyata keçirilməsində Tələbə Həmkarlar İttifaqı Təşkilatlarının yeri və rolu” adlı konfrans



Sentyabrın 10-12-də “Azərbaycan gəncliyi 2017-2021 illərdə” Dövlət Proqramının həyata keçirilməsində Tələbə Həmkarlar İttifaqı Təşkilatlarının yeri və rolu” adlı konfrans keçirilib. Konfrans Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin Nabrandakı “Təhsil” istirahət kompleksində gerçəkləşib. Konfransda Tələbə Həmkarlar İttifaqı Təşkilatlarının ölkəmizin ictimai-mədəni həyatında və bütövlükdə dövlət gənclər siyasətinin həyata keçirilməsində mühüm rol oynadığı xüsusi vurğulanıb.

Qeyd edək ki, konfransda Azərbaycan Dövlət Pedaqoji Universitetinin Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vurğun Məmmədov və universitetin fəal tələbələri iştirak ediblər.

# ADPU-nun əməkdaşları EQAC layihəsi çərçivəsində keçirilmiş təlimlərdə iştirak ediblər

26 avqust - 1 sentyabr tarixlərində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) də tərəfdaşlarından biri olduğu "Azərbaycan universitetlərində Keyfiyyətin təminatı mərkəzlərinin yaradılması və inkişaf etdirilməsi" (EQAC) layihəsi çərçivəsində nəzərdə tutulan ilk xarici səfər baş tutub. Avropa İttifaqının Erasmus+ proqramı üzrə Bakı Biznes Universitetinin koordinatorluğu ilə həyata keçirilən bu layihə çərçivəsində təşkil olunmuş İsveç görüşündə ADPU-nun Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov və Tədqiqat və inkişaf şöbəsinin mütəxəssisi Xəyyam Cəfərzadə iştirak ediblər.

Qeyd edək ki, bu ilin aprel ayında geniş təqdimatı keçirilmiş layihədə Azərbaycan Respublikasının Təhsil Nazirliyi, ölkəmizin 11 ali təhsil müəssisəsi və Avropadan 5 tərəfdaş müəssisə iştirak edir. ADPU-da son illər rektor, professor Cəfər Cəfərovun rəhbərliyi ilə keyfiyyətə əsaslanan idarəçiliyi inkişaf etdirmək məqsədilə keyfiyyətin təminatı mexanizmlərinin, o cümlədən qiymətləndirmə, keyfiyyəti idarəetmə sisteminin tədris-təlim prosesinə inteqrasiyası, daxili və xarici audit və s. həyata keçirilməsi ilə bağlı işlər gerçəkləşdirilir.

Paytaxt Stokholm şəhərində yerləşən Kral Texnologiya İnstitutunda (KTH) keçirilən təlimin ilk günündə institutun prorektoru Stefan Ostlund və həmin təhsil müəssisəsi üzrə koordinator Viktor Kordas çıxış edərək 1827-ci ildə yaradılmış Kral Universitetinin tarixi və əldə olunmuş na-



iliyyətlər haqqında məlumat veriblər, universitet şəhərciyində qısa tanışlıq gəzintisi təşkil olunub. Təhsildə keyfiyyətin təmin olunması siyasəti və alətlər, müxtəlif sorğuların aparılması, tədqiqat, tədris və idarəetmənin keyfiyyətinin qiymətləndirilməsi və s. haqqında ekspertlər tərəfindən təqdimatlar nümayiş etdirilib. Növbəti günlərdə keyfiyyət alətlərinin proqram və ixtisaslara tətbiqi, Kral Texnologiya İnstitutunun keyfiyyət strukturu və siyasəti, müasir təlim texnologiyaları, İsveç ali təhsil sistemi, keyfiyyətin təminatı sistemi haqqında danışılıb.

Avqustun 30-da layihə iştirakçıları Stokholm şəhərindən 70 kilometr şimalda yerləşən Uppsala şəhərində Skandinaviyanın ən qədim ali təhsil müəssisəsi olan, əsası 1477-ci ildə qoyulmuş Uppsala Universitetində olublar. Ali məktəblə qısa tanışlıqdan sonra universitetin Keyfiyyətin Təminatı Mərkəzi və onun şöbələrinin rəhbərlərinin mövcud təcrübə ilə bağlı təqdimatları olub, müzakirələr aparılıb. Tədbir iştirakçıları səfər müddətində İsveçin tarixi-mədəni abidələrinin, o cümlədən Kral Sarayının, Nobel Muzeyinin, Böyük Meydanın, Hökumət Evinin, körpülərin və s. yerləşdiyi Köhnə Şəhərdə, Uppsala kilsəsində, 1628-ci ildə batmış və 333 ildən sonra suyun altından tapılmış gəminin və onunla bağlı olan əşyaların nümayiş olunduğu Vasa Muzeyində olublar.

Sonuncu gün təqdimatlar davam edib, təlimə yekun vurulub və tədbir iştirakçıları müvafiq sertfikatlarla təltif olunublar. ADPU-nun əməkdaşları KTH üzrə layihə koordinatoruna universitetin təbliğat materiallarını, eləcə də Bakı şəhərinin mənzərəsini əks etdirən suvenir, Azərbaycan haqqında xarici dillərdə nəşr olunmuş kitabları təqdim ediblər.

# ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində Bilik Günü




Sentyabrın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin (ADPK) Yasamal və Sabunçu tədris binalarında Bilik Günü və yeni tədris ilinin başlanması münasibətilə tədbir keçirildi.

Tədbiri giriş sözü ilə ADPK-nin direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov açıq elan edərək müəllim və tələbə heyətini Bilik Günü münasibətilə təbrik etdi. Qulu Novruzov çıxışında həmçinin Bakının 100 il öncə Nuru Paşanın rəhbərliyi ilə Qafqaz İslam Ordusu tərəfindən bolşevik hərbi birləşmələri, yadelli işğalçılar və daşnak quldurlarından azad edilməsinin əhəmiyyətini vurğuladı.

ADPK-nin Yasamal tədris binasında keçirilən tədbirdə Yasamal Rayon İcra Hakimiyyətinin başçısı Əziz Əzizov, eləcə də rayonun icra hakimiyyəti başçısının müavini Təravət Muradova və Ərazi idarəetmə orqanları ilə iş üzrə şöbəsinin müdiri Zöhrab Cəfərov müəllim və tələbə kollektivini bayram münasibətilə təbrik etdilər.

Yekunda yüksək bal toplayan tələbələr müxtəlif hədiyyələr ilə mükafatlandırıldılar. Tədbir konsert proqramı ilə başa çatdı. Bilik Gününə həsr olunmuş tədbir ADPK-nin Sabunçu tədris binasında davam etdirildi.

# ADPU-nun Quba Filialında 15 Sentyabr-Bilik Günü tədbiri

Sentyabrın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialında nın və tələbələrin nailiyyətləri haqqında ətraflı məlumat verib.

Sonra tədbirdə filialın tər-



15 Sentyabr-Bilik Günü ilə əlaqədar tədbir keçirilib.

Tədbiri giriş sözü ilə filialın Pedaqoji fakültəsinin dekanı, filologiya üzrə fəlsəfə doktoru Qələmşah İdrisov açıb, filialda 2018-2019-cu tədris ilinə hazırlıqla əlaqədar görülən işlərdən bəhs edib.

Filial haqqında ümumi məlumatı oriyentasiya təqdimatı şəklində filialın dekan müavini Nübar Bayramova təqdim edib, maddi-texniki baza, filialda görülən işlər, filial əməkdaşları- biyə işləri üzrə direktor müavini Aysel Şeydayeva, Ədəbiyyat və dillər kafedrasının baş müəllimləri Cəfər Səlimov, Rahib Alpanlı, Tələbə Gənclər Təşkilatının sədri Həcər Seyidəhmədova, 2018-2019-cu tədris ilində ADPU-nun Quba Filialına 670 bal toplayaraq qəbul olunan Nübar Rəhimova və onun valideyni İlkin Rəhimov çıxış edib, bütün professor, müəllim və tələbə kollektivini yeni tədris ilinin başlanması münasibətilə təbrik ediblər.

# ADPU-nun Şamaxı Filialında Bilik Günü ilə bağlı tədbir

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı Filialında 2018-2019-cu dərs ilinin başlanması təntənəli şəkildə qeyd olundu. 15 Sentyabr-Bilik Gününə həsr olunmuş tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başladı.

Giriş sözü ilə çıxış edən filialın direktoru, dosent Tünzalə Yusifova professor-müəllim heyətini, tələbələri, valideynləri və qonaqları Bilik Günü münasibətilə təbrik etdi. O, çıxışında dövlətin təhsilə və təhsil işçilərinə diqqət və qayğısından danışaraq bildirdi ki, filiala qəbul olunan tələbələr müqəddəs, şərəfli və məsuliyyətli peşə olan müəllimlik peşəsini seçməkdə yanılmamışlar. T.Yusifova onu da qeyd etdi ki, ümummilli lider Heydər Əliyev müəllimlik peşəsini yüksək qiymətləndirərək demişdir: "Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram". Ulu Öndərimizin layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev demişdir ki, müəllim Azərbaycanda ən hörmətli insandır.




Qeyd olundu ki, bu il Şamaxı Filialı tələbə qəbulu zamanı yüksək nəticə əldə etmişdir. Belə ki, qəbul planında ayrılmış 120 yer 100 faiz dolmuşdur. Onlardan "İbtidai sinif müəllimliyi" ixtisası üzrə 24 tələbə, "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi" ixtisası üzrə 25 tələbə, "Tarix və coğrafiya müəllimliyi" ixtisası üzrə 25 tələbə, "Riyaziyyat və informatika müllimliyi" ixtisası üzrə 25 tələbə, "Məktəbəqədər təlim və tərbiyə" ixtisası üzrə 19 tələbə, ümumilikdə 118 tələbə qeydiyyatdan keçərək tələbə adını qazanmışdır. Həmin tələbələrdən 6 nəfəri dövlət sifarişi əsasında təhsil alacaqlar. 2 nəfər 500-dən yuxarı bal toplamışdır.

Təbii ki, bu nəticə təsadüfi deyil. Bu uğurun arxasında yüksək idarəçilik bacarıqları, güclü elmi potensiala malik professor-müəllim heyəti, müasir standartlara uyğun maddi-texniki baza və filialda yaradılmış müsbət psixoloji mühit dayanır. Tələbələr filiala qədəm qoyduqları gündən yüksək şəkildə təşkil olunmuş tədris prosesinin və ictimai-tərbiyəvi fəaliyyətin iştirakçılarına çevrilir, bir sözlə, dövlətimizə layiqli bir vətəndaş kimi yetişirlər.

Sonra Təbiət və pedaqoji elmlər kafedrasının müəllimi Çingiz Dadaşov və Dil, ədəbiyyat və onların tədrisi metodikasının müəllimi Rima Quliyeva öz çıxışlarında filialın rəhbərliyi başda olmaqla bütün kollektivi və tələbələri yeni dərs ilinin başlanması münasibətilə təbrik edərək onlara bu şərəfli işlərində uğurlar arzuladılar. Çıxışlar zamanı qeyd olundu ki, filialda ixtisaslaşmış kadrların yetişdirilməsi üçün hər bir şərait var.

Tədbirdə I tədris ili tələbələrinin valideynlərindən professor Təyyar Cavadov və Mehman Rəcəbov də öz sevinclərini hər kəslə bölüşdülər. Onlar ADPU-nun rəhbərliyinə öz təşəkkürlərini bildirdilər və övladlarının məhz bu ali təhsil müəssisəsində təhsil almalarından məmnunluqlarını ifadə etdilər.

I tədris ili tələbələrindən filialın "İbtidai sinif müəllimliyi" ixtisasına 518 balla qəbul olunmuş Səmayə Abdullayeva, 513 balla qəbul olunmuş Nərgiz Ağayeva, "Tarix və coğrafiya müəllimliyi" ixtisasına 457 balla qəbul olunmuş Fidan Əhmədova hamını Bilik Günü münasibətilə təbrik edərək elm yollarında onlara çıraq tutacaq müəllimlərinə əvvəlcədən öz təşəkkürlərini bildirdilər.

Tədbirdə filialın məzunu Sərvər Ağayev çıxış edərək ixtisaslaşmış kadr kimi yetişməsində əməyi olan filialın pedaqoji kollektivinə təşəkkür etdi, onları bu əlamətdar gün münasibətilə təbrik etdi.

Sonra 2018-2019-cu tədris ilində filiala qəbul olunan tələbələr və onların valideynləri ilə filial rəhbərliyinin görüşü keçirildi. Filial ilə ailələr arasında əlaqələri daha da gücləndirmək və filial haqqında məlumat vermək məqsədilə keçirilən görüşdə filialın direktoru T.Yusifova təlim-tərbiyə işində ali təhsil müəssisəsi ilə ailənin birgə əlaqəsindən danışaraq görüşün əhəmiyyətini vurğuladı və qeyd etdi ki, bizim qarşımızda duran əsas vəzifələrdən biri savadlı, geniş dünyagörüşünə və yüksək intellektə malik, Vətənə, cəmiyyətə layiqli gənclər yetişdirməkdir. Tələbələrin ixtisaslı kadrlar kimi yetişməsində tək filialın yox, ailənin də üzərinə mühüm vəzifələr düşür. Məhz buna görə də valideynlər daim bizimlə sıx əlaqə qurmalıdırlar.

Boloniya prosesinin prinsiplərinə uyğun olaraq təhsilin keyfiyyətinin yüksəldilməsini, tədris prosesində elektron vasitələrdən, informasiya texnologiyalarından istifadə edildiyini, tədrisin müasir tələblər səviyyəsində təşkil olunduğunu nəzərə çatdıran filialın direktoru vurğuladı ki, imtahan sessiyalarının şəffaf və obyektiv keçirilməsini təmin etmək məqsədilə semestr imtahanları zamanı media nümayəndələri və valideynlər üçün "Açıq qapı günləri" keçirilir. Filialın yüksək elmi potensiala malik olması, burada yerli kadrlarla yanaşı ADPU və başqa nüfuzlu ali təhsil müəssisələrindən dəvət olunan professor-müəllim heyətinin də çalışdığı qeyd olundu.

O, həmçinin tələbələr ilə filial arasında bağlanan müqavilənin şərtlərindən irəli gələn vəzifələrdən də danışdı.

Azərbaycanın müxtəlif bölgələrindən olan valideynlər çıxış edərək, filialla tanış olduqlarını və yaradılan yüksək şəraitdən, bu səmimi görüşdən məmnunluqlarını ifadə etdilər. Bu ali təhsil ocağında övladlarına bilik və bacarığını sərf edən professor-müəllim heyətinə, o cümlədən onların suallarını ətraflı cavablandırdığı üçün filialın rəhbərliyinə minnətdarlıqlarını bildirərək, bu cür görüşlərin davamlı olmasını arzuladılar.

Sonda filialın strukturu və tədris prosesindən ibarət geniş oriyentasiya təqdimatının nümayiş olunması valideynlərin filialla daha yaxından tanış olmalarına şərait yaratdı.

# ADPU-nun Şəki Filialında yeni tədris ilinin başlanması münasibətilə tədbir

**Sentyabrın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki Filialında 2018-2019-cu tədris ilinin başlanması münasibətilə tədbir keçirilib. Tədbirdə filialın professor-müəllim heyəti, filiala yeni qəbul olunan tələbələr və onların valideynləri iştirak ediblər.**

Tədbiri giriş sözü ilə filialın direktoru, riyaziyyat üzrə elmlər doktoru, dosent Rafiq Rasulov açaraq yeni qəbul olunan tələbələri və onların valideynlərini təbrik edib, uğurlar arzulayıb. R.Rasulov bildirib ki, yeni tədris ili filialımız və bütövlükdə ADPU üçün uğurlu il olub, tələbə qəbulunun nəticələrində əvvəlki illərlə müqayisədə dinamik artım müşahidə edilib. Respublikamızda təhsilin inkişafı istiqamətində həyata keçirilən məqsədyönlü tədbirlər, müəllimlik peşəsinə dövlətimizin diqqət və qayğısı istedadlı və bacarıqlı gənclərin bu sahəyə həvəslə üz tutmaları ilə nəticələnib. Sevindirici haldır ki, yüksək bal toplamış 2000-dən çox gənc bu il müəllimlik ixtisasına üz tutub. Natiq qeyd edib ki, bu il filialımızda mövcud olan 8 ixtisas üzrə 200 plan yeri tam dolub. R.Rasulov çıxışında onu da qeyd edib ki, filiala qəbul olunan tələbələr sırasında 500-dən və 600-dən çox bal toplayanların sayı ilbəil artır. Bu il filiala qəbul olunan tələbələrdən 3 nəfəri 600-dən, 18 nəfəri isə 500-dən çox bal toplayıb. Direktor yeni qəbul olunan tələbələrə seçdikləri şərəfli və məsuliyyətli müəllimlik peşəsinə yiyələnmək yolunda uğurlar arzulayıb.




Tədbirdə filialın tədris işləri üzrə direktor müavini, dosent Gülarə Abdullayeva, elmi işlər üzrə direktor müavini, dosent Nuralı Çələbiyev, Təbiət fənləri və onların tədrisi metodikası kafedrasının müdiri, professor Firədun İbrahimov, Ümumelmi fənlər kafedrasının müdiri, pedaqogika üzrə fəlsəfə doktoru, baş müəllim Sədrəddin Bədiyev, tərbiyə işləri üzrə təşkilatçı, baş müəllim Xuraman Həmidova, Pedaqoji fakültənin dekanı, filologiya üzrə fəlsəfə doktoru, baş müəllim Xalidə Abdullayeva, Filologiya fakültəsinin dekanı, dosent Ulduz Mürşüdova, Dillər kafedrasının müdiri, baş müəllim Əsmayə Əkbərova və başqaları çıxış edərək yeni qəbul olunan tələbələri təbrik edib, onlara arzularını bildiriblər.

Sonra filiala 500 və 600-dən çox bal toplayaraq qəbul olunan 21 nəfər tələbəyə Fəxri fərman və hədiyyə təqdim olunub.

Sonda xatirə şəkilləri çəkilib.

# ADPU-nun Ağcabədi Filialında Bilik Günü və I tədris ili tələbələri ilə Oriyentasiya görüşü

**Sentyabrın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi Filialında 2018-2019-cu tədris ilinin başlanması münasibətilə Bilik Günü və I tədris ili tələbələri ilə Oriyentasiya görüşü keçirildi.**



Tədbiri giriş sözü ilə açan filialın direktoru, dosent Mətanət Fərzəliyeva tədbir iştirakçılarını salamlayaraq onları Bilik Günü münasibətilə təbrik etdi.

Sonra Azərbaycan Respublikasının Dövlət Himni səsləndirildi.

Çıxışına davam edən dosent M.Fərzəliyeva müəllim peşəsinə son dövrlər artan marağı yüksək qiymətləndirərək qeyd etdi ki, yüksək nəticə əldə etmiş abituriyentlərin müəllim peşəsini seçməsi təhsilimizin gələcək uğurlarından xəbər verir. Əsası ulu öndər Heydər Əliyev tərəfində qoyulan, bu gün də möhtərəm Prezidentimiz cənab İlham Əliyev tərəfindən uğurla həyata keçirilən təhsil siyasəti öz müsbət nəticələrini verir.

Ölkəmizdə pedaqoji kadr hazırlayan tədris müəssisələrindən biri olan ADPU-nun Ağcabədi Filialı regionun pedaqoji kadra olan tələbatının ödənilməsində mühüm rol oynayır. Pedaqoji kollektiv olaraq gələcək fəaliyyətimizdə də Vətənə, xalqa lazım olan yüksək bilikli vətənpərvər kadrlar hazırlayacağımıza çalışacağıq.

Sonra dosent M.Fərzəliyeva ADPU-nun rektoru, professor Cəfər Cəfərovun tələbə adını qazanaraq ADPU-ya, onun filiallarına qəbul olunmuş tələbələrə təbrikini çatdırdı, Ağcabədi Filialına qəbul olunmuş I tədris ili tələbələrini tələbə adını qazanmaları münasibətilə təbrik etdi.

Tədbirdə iştirak edən filialın dosenti Məhəmməd Hüseynov, tədris və elmi işlər üzrə direktor müavini, dosent Seymur Süleymanov, Tərbiyə işləri üzrə direktor müavini, dosent Mahir Səlimov, valideynlərdən Süleyman Qasımov çıxış edərək Bilik Günü münasibətilə tədbir iştirakçılarını təbrik etdilər. Müəllim peşəsini seçmiş tələbələri bu müqəddəs, şərəfli peşəyə layiqincə sahib olmağa çağırdılar.

Filiala yüksək balla qəbul olunmuş tələbələr- Ərturqt Muxtar oğlu Bağırlı, Lalə Eldəniz qızı Qasımova, Lalə Vüqar qızı Qasımova filial rəhbərliyi tərəfindən qiymətli hədiyyələrlə mükafatlandırıldılar.

Tədbir I tədris ilinin tələbələri ilə Oriyentasiya görüşü ilə davam etdirildi. Filialın direktoru, dosent M.Fərzəliyeva I tədris ili tələbələri və onların valideynləri ilə keçirilən görüşdə filialın professor-müəllim heyətini tədbir iştirakçılarına təqdim etdi. Filialda fəaliyyət göstərən struktur bölmələr, filialın daxili nizam-intizam qaydaları barədə geniş məlumat verdi, tələbələri maraqlandıran suallar cavablandırıldı.

Sonda I tədris ili tələbələri ilə xatirə şəkli çəkdirildi.

# ADPU-nun Cəlilabad Filialında yeni tədris ilinin başlanması münasibətilə tədbir və Oriyentasiya Günü

**Sentyabrın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Cəlilabad Filialında 2018-2019-cu tədris ilinin başlanması münasibətilə geniş tədbir keçirilib. Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlayıb.**

Tədbirdə filialın Təbiət və riyazi fənlər kafedrasının əməkdaşı Ayaz Həsənov, İxtisas fənləri kafedrasının əməkdaşı Mahmudağa Qasımov və filialın tələbələri Aytən Hüseynova, Əmin Əmirov, Mirfəridə Soltanova, Yusif Məmmədov və başqaları çıxış edərək yeni tədris ilinin başlanması münasibətilə filialın pedaqoji heyətini və tələbə ilə filialın Pedaqoji fakültəsinin dekanı Mənzilə Rəhimova çıxış edib. Təqdimatda filialın fəaliyyətdə olduğu 18 ildə əldə etdiyi nailiyyətlər, kadr hazırlığı istiqamətində prioritetlər, filialın potensial imkanları, eləcə də kadr potensialı, tədris prosesinin təşkili və keçirilməsi, filialın daxili intizam qaydaları, ictimai tələbə təşkilatlarının fəaliyyəti və s. bu kimi məsə-




Tədbiri giriş sözü ilə açan filialın direktoru, dosent Xudayar Sultanlı professor-müəllim heyətini, tələbə kollektivini, eləcə də tələbələrin valideynlərini yeni tədris ili münasibətilə təbrik edib, bütün tədbir iştirakçılarına gələcək fəaliyyətlərində uğurlar arzulayıb. Dövlətin təhsil və gənclər siyasətindən, təhsilə olan qayğısından söz açıb. Tələbələrə öz ixtisaslarına dövrün tələbləri səviyyəsində yiyələnmələri barədə tövsiyələr verib.

Sonra 500-dən yuxarı bal toplayaraq tələbə adını qazanan I tədris ili tələbələrinə universitet tərəfindən hədiyyələr təqdim edilib.

kollektivini təbrik ediblər. Tədbir I tədris ilinə qəbul olunan tələbələrin valideynlərinin təbrik çıxışları ilə yekunlaşıb.

Daha sonra filialda I tədris ili tələbələri ilə Oriyentsaiya Günü keçirilib. Giriş sözü ilə çıxış edən tədris və elmi işlər üzrə direktor müavini Eyvaz Məmmədov tələbələrə təhsillərində uğurlar arzulayıb. Bildirib ki, hərtərəfli dünyagörüşünə malik, yüksək mənəvi-əxlaqi və milli dəyərləri özündə birləşdirən, ixtisasına dərindən yiyələnmiş müəllim kadrlarının hazırlanması filialın başlıca məqsədidir.

Oriyentasiya təqdimatı lələr barədə məlumatlar öz əksini tapıb. Kadr hazırlığı prosesində filialın əsas hədəfləri, təklif etdiyi üstünlüklər açıqlanıb. Fakültə dekanı M. Rəhimova qeyd edib ki, tələbələrin qlobal dünyanın tələblərinə cavab verən, yüksək elmi-nəzəri və praktik bacarıqlara malik kadr kimi yetişdirilməsi ilə yanaşı, eyni zamanda onların Vətənimizə, xalqımıza, müstəqil Azərbaycan dövlətinə sadiq əsl vətəndaş kimi hazırlanması bizim başlıca amalımızdır.

Sonda fakültə dekanı tələbələri və valideynləri maraqlandıran sualları cavablandırıb.

Redaktor əvəzi: Mahirə MUSTAFAYEVA

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 2961
Sayı: 1500
Çapa imzalanıb: 28.09.2018-ci il

ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsində yığılıb, "Azərbaycan" Nəşriyyatında səhifələnib və ofset üsulu ilə çap edilib.